BAKI UNİVERSİTETİNİN XƏBƏRLƏRİ
*№2 Humanitar elmlər seriyası 2014*

**UOT 94 (479.24)**

# ŞƏKİ RAYONUNUN 1991-2009-cu İLLƏRDƏ İNZİBATİ - ƏRAZİ BÖLGÜSÜ VƏ ONA EDİLƏN DƏYİŞİKLİKLƏR

**A.Ə.MƏMMƏDOVA, U.M.PAŞAYEVA**
***Bakı Dövlət Universiteti***
***arzuashraf@mail.ru; star.miri@mail.ru***

*Məqalə Azərbaycan Respublikasının siyasi-iqtisadi-mədəni həyatında mühüm rol oynamış Şəki rayonunun inzibati-ərazi bölgüsünə həsr olunmuşdur. 1991-ci ildə Azərbaycanın müstəqilliyinə qovuşduğu tarixdən rayonun inzibati-ərazi quruluşunda və əhalisinin sayında baş verən dəyişikliklər siyahıyaalma materialları əsasında izlənilmiş və rayonun inkişaf tempini, əhalinin artım sayına təsir göstərən səbəbləri görməyə imkan verən nəticələr əldə edilmişdir.*

**Açar sözlər:** Şəki, Şəki rayonu, Azərbaycan Respublikası

1991-ci ildə Azərbaycan dövlət müstəqilliyinə yenidən qovuşanda dövlətçilik tariximizdə mühüm rol oynamış ərazilərimizdən olan Şəki inzibati cəhətdən tərkibində respublika tabeli şəhərin, qəsəbə və kənd yaşayış məntəqələrinin olduğu rayon idi. Rayon sovet dövründə də özünün mühüm strateji-iqtisadi-mədəni əhəmiyyətini saxlamış və Şəki-Zaqatala iqtisadi-coğrafi rayonuna daxil olan digər rayonlar – Balakən, Zaqatala, Qax, Oguz, Qəbələ rayonları arasında əlaqələndirici funksiyası daşıyan mərkəz rolunu oynamışdır[1]. 1999-cu

[1] Rayon – inzibati-ərazi bölgüsü ilk dəfə olaraq 1930-cu ildə Azərbaycan SSRİ-də tətbiq edilmişdir. Azərbaycan dövlət müstəqilliyinə qovuşduqdan sonra isə respublikada bu inzibati-ərazi bölgüsü saxlanılmışdır. Azərbaycan Respublikasının "Ərazi quruluşu və inzibati ərazi bölgüsü haqqında" qanununun 5-ci maddəsinə əsasən Azərbaycan Respublikasının ərazi quruluşunu Azərbaycan Respublikasının ərazisində yerləşən rayon, şəhər, qəsəbə və kənd statusuna malik olan ərazi vahidləri təşkil edir ki, hər bir ərazi vahidinin sərhədi, adı və onun ərazisində daimi yaşayan əhalinin sayı müəyyən olunur. Ərazi vahidlərinə şəhər, qəsəbə və kənd statusu onların ərazisində daimi yaşayan əhalinin sayından və ya əksəriyyətinin məşğul olduğu fəaliyyət (təsərrüfat) növündən, ərazinin sosial-iqtisadi inkişaf səviyyəsindən, istehsalat, yaxud sosial-mədəni infrastrukturun ixtisaslaşmasından və müvafiq ərazidə həyata keçirilən dövlət funksiyalarından asılı olaraq verilir. Qanuna əsasən, Azərbaycan Respublikasının rayonları onların ərazisində yerləşən ayrı-ayrı şəhərlərdən, qəsəbələrdən, kəndlərdən və inzibati-ərazi dairələrindən təşkil olunur (1).

il əhali siyahıyaalmasına əsasən Şəki-Zaqatala iqtisadi-coğrafi rayonuna daxil olan rayonların həmin ilə inzibati-ərazi bölgüsü aşağıdakı kimi olmuşdur.

**Cədvəl 1**

**1999-cu ildə Azərbaycan Respublikası və Şəki-Zaqatala iqtisadi-coğrafi rayonu üzrə inzibati-ərazi bölgüsü**

| | İnzibati-ərazi vahidlərinin sayı | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | Şəhərlər | | | | Şəhər tipli qəsəbələr, fəhlə qəsəbələri | Qəsəbələr | Kənd yaşayş məntəqələri |
| | Cəmi | o cümlədən | | | | | |
| | | Respublika tabeliyində | Nax.MR tabeliyində | Rayon tabeliyində | | | |
| Azərbaycan Respublikası üzrə: | 69 | 11 | 3 | 55 | 132 | 83 | 4227 |
| Balakən | 1 | - | - | 1 | 1 | - | 57 |
| Qax | 1 | - | - | 1 | - | - | 58 |
| Qəbələ | 1 | - | - | 1 | - | - | 61 |
| Oğuz | 1 | - | - | 1 | - | - | 33 |
| Şəki | 1 | 1 | - | - | 1 | - | 65 |
| Zaqatala | 1 | - | - | 1 | 1 | 2 | 60 |

**Mənbə:** Azərbaycan Respublikası Əhalinin Siyahıyaalınması 1999-cu il, Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. Bakı: Səda, 2000, I hissə, 566 s., s.12-13.

Cədvəldən göründüyü kimi, Şəki rayonu 67 inzibati-ərazi vahidinə - 1 respublika tabeli şəhər, 1 şəhər tipli qəsəbə, 65 kənd - bölünmüşdü. Qeyd edək ki, Şəki rayonu ərazisinin sahəsinə və inzibati-ərazi vahidlərinin sayına görə Şəki-Zaqatala iqtisadi-coğrafi rayonuna daxil olan 6 rayon arasında birinci gəlir.

**Cədvəl 2**

**Şəki-Zaqatala iqtisadi-coğrafi rayonuna daxil olan rayonların ərazisi, əhalisinin sayı və sıxlığı (1 kv.km. nəfər) 1999-cu il siyahıyaalmasına əsasən**

| Rayonlar-şəhərlər | Yaranma tarixi | Ərazi (min kv.km.) | Əhalinin sayı (nəfər) | Əhalinin sıxlığı (1 kv.km. nəfər) |
|---|---|---|---|---|
| Azərbaycan Respublikası | - | 86,6 | 7953438 | 92 |
| Şəki rayonu | 08.08.1930 | 2.43 | 157353 | 65 |
| Zaqatala rayonu | 08.08.1930 | 1.35 | 107240 | 79 |
| Oğuz rayonu | 08.08.1930 | 1.22 | 36488 | 30 |
| Qəbələ rayonu | 08.08.1930 | 1.55 | 82803 | 53 |
| Qax rayonu | 08.08.1930 | 1.49 | 51161 | 34 |
| Balakən rayonu | 08.08.1930 | 0.92 | 83732 | 91 |

**Mənbə:**.Azərbaycan Respublikası Əhalinin Siyahıyaalınması 1999-cu il, Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. Bakı: Səda, 2000, I hissə, s.10-11.

Şəki rayonu sahəsinə və əhalinin sayına görə Zaqatala, Balakən, Oguz, Qəbələ, Qax rayonları arasında birinci, əhalinin sıxlığına görə isə 6 rayon arasında Balakən və Zaqatala rayonlarından sonra gəlir (bax: cədvəl 2). Müqayisə üçün qeyd edək ki, 1989-cu ildə rayonun əhalisinin sayı 138069 nəfər olmuşdur. Keçən 10 il ərzində və ya 1989-1999-cu il siyahıyaalmaları arasındakı müddətdə əhalinin sayı 157353 nəfərədək artmışdır ki, bunun da 63112 nəfəri

şəhər əhalisi, 94241 nəfəri isə kənd əhalisi idi. Deməli, 10 il ərzində rayon əhalisinin artım sayı 19284 nəfər olmuşdur (bax: cədvəl 3).

Cədvəl 3

**Azərbaycan Respublikasında və respublikanıın şəhər və rayonlarında əhalinin sayı və dəyişilməsi**

| Rayonlar-şəhərlər | Əhalinin sayı | | 1999-cu il 1989-cu ilə nisbətən (faizlə) |
|---|---|---|---|
| | 1989-cu il | 1999-cu il | |
| Azərbaycan Respublikası | 7021178 | 7953438 | 113.3 |
| Şəki rayonu | 138063 | 157353 | 114.0 |
| Zaqatala rayonu | 92185 | 107240 | 116.3 |
| Qəbələ rayonu | 72862 | 82803 | 113.6 |
| Qax rayonu | 44373 | 51161 | 115.3 |
| Balakən rayonu | 68300 | 83732 | 122.6 |
| Oğuz rayonu | 31815 | 36488 | 114.7 |

**Mənbə:**.Azərbaycan Respublikası Əhalinin Siyahıyaalınması 1999-cu il, Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. Bakı: Səda, 2000, I hissə, s.15-17.

Son 2009-cu il siyahıyaalmasına görə, Şəki rayonunun əhalisinin sayı 1999-2009-cu illər ərzində 157353 nəfərdən 170733 nəfərədək yüksəlmiş, beləliklə, keçən 10 il ərzində bu rayonda əhalinin sayı 13380 nəfər artmışdır. Rəqəmlərin əvvəlki siyahıyaalmaların nəticələrilə müqayisəsi göstərir ki, əhalinin artım sayı əvvəlki illərə nisbətən xeyli azalmışdır. Belə ki, 1989-1999-cu il siyahıyaalmaları arasındakı müddətdə artım 19284 nəfər olmuşdursa, indi bu rəqəm 13380 nəfərə enmişdir. Deməli, müşahidə edilən artımın ozü də 10 il əvvəllə müqayisədə 5904 nəfər azdır (bax: cədvəl 3).

Artım isə daha çox kənd əhalisinin sayında qeydə alınmışdı: kənd əhalisinin sayı 94241 nəfərdən 105.448 nəfərədək artmışdır. Statistik rəqəmlərə əsasən iki siyahıyaalma arasındakı müddətdə (1999-2009-cu illər) şəhər əhalisinin sayı cəmi 2173 nəfər artmış və 63112 nəfərdən 65285 nəfərə yüksəlmişdi. Beləliklə, 13380 nəfərlik artımın 11207 nəfəri kənd əhalisinin payına düşür (3,13; 4, 19).

Şəki rayonunun ərazi və əhalisinə dair ümumi məlumatlarla tanışlıqdan sonra, rayonun tərkibindəki yaşayış məskənlərinə dair məlumatlara diqqət yetirək: 1999-cu il siyahıyaalmasına görə yaşayış məskənlərinin sayı 67 - 1 respublika tabeli şəhər, 1 şəhər tipli qəsəbə və 15 inzibati-ərazi vahidində birləşdirilmiş 65 kənd yaşayış məntəqəsi idi (3). 1999-2000-ci illərdə rayonun inzibati-ərazi quruluşunda edilən dəyişikliklər yaşayış məskənlərinin sayında özünü göstərir: 2 şəhər tipli qəsəbə və 31 kənd ərazi dairəsində birləşdirilmiş 68 kənd yaşayış məntəqəsi (4).

1999-cu il siyahıyaalma materiallarına əsasən, rayonun tərkibində olan inzibatı vahidlər arasında əhalisinin sayına görə birinci yerdə Şəki şəhəri - 63.112 nəfər gəlirdi. Əhalisinin ümumi sayı 5000 nəfərdən çox olan kəndlərin sayı 3 (Kiçik Dəhnə, Kiş, Baş Göynük) idi. 4 kəndin (Böyük Dəhnə, Qoxmuq, Oxud, Baş Zəyzid) əhalisinin sayı 4000 nəfəri ötmüşdü. 23 kəndin əhalisinin sayı 1000-2000 nəfər, 32 kəndin əhalisinin sayı 100-900 nəfər, 3 kəndin

əhalisinin sayı isə 66-95 nəfər arasında dəyişirdi. Rayonun tərkibində olan kəndlər Böyük Dəhnə, Kiçik Dəhnə, Baltalı, Qoxmuq, Oxud, Şəki və Kiş kəndləri istisna olmaqla 15 ərazi vahidində birləşdirilmişdilər. Ərazi vahidləri adətən bir-birinə çox yaxın olan, hətta bəzilərində qaynayıb qarışmış kəndləri özündə birləşdirirdi. Lakin bəzən əksinə də olurdu ki, bu məsələyə aşağıda aydınlıq gətirəcəyik. Baş Ğöynük, Baş Zəyzid, Cəyirli, Suçma ərazi vahidlərinin hər birinə 2, Orta Zəyzid, İnçə ərazi vahidlərinə 3, Aydınbulaq, Cumaykənd, Aşağı Küngüt, Baş Layısqı ərazi vahidlırinə 4, Turan, Baş Küngüt, Cəfərabad ərazi vahidlərinə 5, Daşüz ərazi vahidinə 6, Aşağı Göynük ərazi vahidinə 7 kənd daxil idi (3).

Cədvəl 4

**Şəki rayonu üzrə inzibati-ərazi bölgüsü və daimi əhalinin sayı (1999-cu il)**

| Sıra sayı | Ərazi vahidinin adı | Ərazi vahidləri üzrə daimi əhalinin ümumi sayı | Ərazi vahidlərinə aid olan yaşayış məntəqələri | Yaşayış məntəqələri üzrə daimi əhalinin sayı |
|---|---|---|---|---|
| | Şəki rayonu | | | 157353 |
| | -şəhər əhalisi | | | 63112 |
| | -kənd əhalisi | | | 94241 |
| | o,cümlədən: | | | |
| | Böyük Dəhnə | | | 4867 |
| | Kiçik Dəhnə | | | 7266 |
| | Baltalı | | | 1829 |
| | Qoxmuq | | | 4243 |
| | Oxud | | | 4603 |
| | Şəki | | | 2761 |
| | Şəki şəhəri | | | 61415 |
| | Kiş | | | 5974 |
| | Turan ŞTQ | | | 1697 |
| 1. | Turan ə/v | 4624 | Qaratorpaq<br>Bolludərə<br>Sarıca<br>Qayabaşı<br>Çay Qaraqoyunlu | 392<br>410<br>964<br>1376<br>1482 |
| 2. | Aydınbulaq ə\v | 2599 | Aydınbulaq<br>Əliyar<br>Şirinbulaq<br>Aşağı Daşağıl | 810<br>483<br>747<br>559 |
| 3. | Aşağı Göynük ə\v | 7708 | Aşağı Göynük<br>Göndələn<br>Aşağı Layıski<br>Abbas<br>II Biləcik<br>I Biləcik<br>Baqqal | 2258<br>903<br>1100<br>582<br>1014<br>1379<br>472 |
| 4. | Aşağı Küngüt ə/v | 2527 | Aşağı Küngüt<br>Fazil<br>İbrahimkənd<br>Çapağan | 1202<br>361<br>661<br>303 |
| 5. | Baş Göynük ə/v | 7621 | Baş Göynük<br>Baş Şabalıt | 6839<br>782 |
| 6. | Baş Zəyzid ə/v | 5905 | Baş Zəyzid<br>Vərəzət | 4326<br>1579 |

| | | | | |
|---|---|---|---|---|
| 7. | Baş Küngüt ə/v | 4462 | Baş Küngüt<br>Bideyiz<br>Oraban<br>Baş Kəldək<br>Aşağı Kəldək | 1365<br>1153<br>945<br>914<br>85 |
| 8. | Baş Layısqı ə /v | 5180 | Baş Layıskı<br>Cunud<br>Şin<br>Qumux | 1956<br>882<br>1447<br>895 |
| 9. | Daşüz ə/v | 3143 | Daşüz<br>Daşbulaq<br>Küdürlü<br>Qudula<br>Arıçılıq<br>Donuzçuluq | 1294<br>444<br>355<br>864<br>120<br>66 |
| 10. | Cəfərabad ə/v | 2903 | Cəfərabad<br>Təpəcənnət<br>Kəhrizoba<br>Göybulaq<br>Çolaxlı | 1582<br>500<br>121<br>605<br>95 |
| 11. | Cəyirli ə/v | 2566 | Cəyirli<br>Qozlubulaq | 1851<br>715 |
| 12. | Cumaykənd ə/v | 4219 | Cumaykənd<br>Babaratma<br>Qaradağlı<br>Şorsu | 1839<br>311<br>259<br>1810 |
| 13. | Orta Zəyzid ə/v | 4026 | Orta Zəyzid<br>Köbər Zəyzid<br>Qırxbulaq | 2833<br>794<br>399 |
| 14. | İnçə ə/v | 3172 | İnçə<br>Zunud<br>Aşağı Şabalıd | 1174<br>1287<br>711 |
| 15. | Suçma ə/v | 2043 | Suçma<br>Dərəcənnət | 1313<br>730 |

**Mənbə:** Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. Azərbaycan Respublikası Əhalinin Siyahıyaalınması 1999-cu il. Bakı: Səda, 2000, I hissə, s.149, 150.

Qeyd edək ki, 1999-cu ildə Şəki rayonunun inzibati-ərazi quruluşunda bəzi dəyişikliklər edilmişdir. Milli Məclisin qəbul etdiyi və 1999-cu il oktyabrın 5-də prezident Heydər Əliyevin imzası ilə qüvvəyə minən qanuna əsasən edilən dəyişiklikləri 2 yerə ayırmaq olar: 1. Bəzi yaşayış məskənlərinə kənd statusu verilir; 2. Yaşayış məskənlərindən bəzilərinin adında dəyişikliklər edilir. Orconikidze şəhər tipli qəsəbəsi Turan şəhər tipli qəsəbə, Orconikidze qəsəbə inzibati-ərazi vahidi isə Turan qəsəbə inzibati-ərazi vahidi adlandırılır (2).

Şəki şəhər inzibati-ərazi vahidi tərkibindəki yaşayış məntəqələri Çeşməli, Oyrat, Aran kəndi adlandırılır və rayonun yaşayış məntəqələrinə dair hesab məlumatına daxil edilir. Orta Zəyzid kənd inzibati-ərazi vahidi tərkibindəki Vayvay kəndi Qırxbulaq, Baş Layısqı kənd inzibati-ərazi vahidi tərkibindəki yaşayış məntəqəsi Qumux kəndi, Daşüz kənd inzibati-ərazi vahidi tərkibindəki Daşüz qəsəbəsi Daşüz kəndi, digər yaşayış məntəqələri Çələbixan qəsəbəsi, Kosalı kəndi, Qızılarx kəndi, Aşağı Göynük kənd inzibati-ərazi vahidi tərki-

bindəki Abbaskənd kəndi – Abbas kəndi, Aşağı Küngüt kənd inzibati-ərazi vahidi tərkibindəki Fazil kəndi – Fazıl kəndi, Baş Küngüt kənd inzibati-ərazi vahidi tərkibindəki Oravan kəndi – Oraban kəndi, Turan qəsəbə inzibati-ərazi vahidi tərkibindəki Bolludərə, Qaratorpaq və Sarıca qəsəbələri müvafiq olaraq Bolludərə, Qaratorpaq və Sarıca kəndləri, Cəyirli kənd inzibati-ərazi vahidi tərkibindəki Qozlubulaq qəsəbəsi Qozlubulaq kəndi hesab edilir (2).

Qeyd edək ki, həmin dəyişikliklər 1999-cu il siyahıyaalmasının çap olunmuş materiallarında öz əksini tapmışdır.

Cədvəl 5

**Şəki rayonu üzrə inzibati-ərazi bölgüsü və daimi əhalinin sayı (2009-cu il)**

| Sıra sayı | Ərazi vahidinin adı | Ərazi vahidləri üzrə əhalinin ümumi sayı | Ərazi vahidlərinə aid olan yaşayış məntəqələri | Daimi əhalinin sayı |
|---|---|---|---|---|
| | Şəki rayonu | | | 170733 |
| | şəhər əhalisi | | | 65285 |
| | kənd əhalisi | | | 105448 |
| | o cümlədən: | | | |
| | Şəki şəhəri | | | 62965 |
| 1. | Turan qəsəbə inzibati ə/d | 3763 | Turan qəsəbəsi<br>Çayqaraqoyunlu kəndi | 2058<br>1705 |
| 2. | Aydınbulaq kənd inzibati ə/d | 1988 | Aydınbulaq kəndi<br>Əliyar kəndi<br>Aşağı Daşağıl kəndi | 873<br>531<br>584 |
| 3. | Aşağı Göynük kənd inzibati ə/d | 5475 | Aşağı Göynük kəndi<br>Köndələn kəndi<br>Aşağı Layışqı kəndi<br>Abbas kəndi | 2791<br>844<br>1265<br>575 |
| 4. | Aşağı Küngüd kənd inzibati ə/d | 1684 | Aşağı Küngüd kəndi<br>Çapağan kəndi | 1358<br>326 |
| 5. | Baş Göynük kənd inzibati ə/d | 8468 | Baş Göynük kəndi<br>Baş Şabalıd kəndi | 7597<br>871 |
| 6. | Baş Zəyzid kənd inzibati ə/d | 6578 | Baş Zəyzid kəndi<br>Vərəzət kəndi | 4788<br>1790 |
| 7. | Baş Küngüt kənd inzibati ə/d | 2776 | Baş Küngüt kəndi<br>Bideyiz kəndi | 1498<br>1278 |
| 8. | Baş Layısqi kənd inzibati ə/d | 5772 | Baş Layısqi kəndi<br>Cunut kəndi<br>Şin kəndi<br>Qumux kəndi | 2184<br>1010<br>1543<br>1035 |
| 9. | Daşüz kənd inzibati ə/d | 1921 | Daşüz kəndi<br>Daşbulaq kəndi<br>Cələbixan qəsəbəsi | 1190<br>469<br>262 |
| 10. | Cəfərabad kənd inzibati ə/d | 3357 | Cəfərabad kəndi<br>Təpəcənnət kəndi<br>Kəhrizoba kəndi<br>Göybulaq kəndi<br>Çolaqlı kəndi | 2005<br>433<br>45<br>730<br>144 |
| 11. | Cəyirli kənd inzibati ə/d | 2806 | Cəyirli kəndi<br>Qozlubulaq kəndi | 2046<br>760 |
| 12. | Orta Zəyzid kənd inzibati ə/d | 4523 | Orta Zəyzid kəndi<br>Köbər Zəyzid kəndi<br>Qırxbulaq kəndi | 3035<br>1034<br>454 |

| | | | | |
|---|---|---|---|---|
| 13. | İnçə kənd inzibati ə/d | 3366 | İnçə kəndi<br>Zumud kəndi<br>Aşağı Şabalıd kəndi | 1355<br>1339<br>672 |
| 14. | Suçma kənd inzibati ə/d | 2385 | Suçma kəndi<br>Dərəcənnət kəndi | 1506<br>879 |
| 15. | Şəki kənd inzibati ə/d | 2958 | Şəki kəndi<br>Aran kəndi | 2457<br>501 |
| 16. | Baş Kəldək kənd inzibati ə/d | 2218 | Baş Kəldək kəndi<br>Aşağı Kəldək kəndi<br>Oraban kəndi | 1053<br>96<br>1069 |
| 17. | Biləcik kənd inzibati ə/d | 3226 | Birinci Biləcik kəndi<br>Baqqal kəndi<br>İkinci Biləcik kəndi | 1500<br>528<br>1198 |
| 18. | Bolludərə kənd inzibati ə/d | 905 | Bolludərə kəndi<br>Qaratorpaq kəndi | 459<br>446 |
| 19 | Çeşməli kənd inzibati ə/d | 1096 | Çeşməli kəndi<br>Oyrat kəndi | 660<br>436 |
| 20. | İbrahimkənd kənd inzibati ə/d | 1093 | İbrahimkənd kəndi<br>Fazıl kəndi | 690<br>403 |
| 21. | Küdürlü kənd inzibati ə/d | 615 | Küdürlü kəndi<br>Kosalı kəndi<br>Qızılarx kəndi | 472<br>127<br>16 |
| 22. | Qayabaşı kənd inzibati ə/d | 2294 | Qayabaşı kəndi<br>Sarıca kəndi | 1428<br>866 |
| 23. | Qudula kənd inzibati ə/d | 1496 | Qudula kəndi<br>Babaratma kəndi<br>Qaradağlı kəndi | 911<br>319<br>266 |
| 24. | Baltalı kənd inzibati ə/d | 2051 | Baltalı kənd | 2051 |
| 25. | Böyük Dəhnə kənd inzibati ə/d | 5418 | Böyük Dəhnə kəndi | 5418 |
| 26. | Cumakənd kənd inzibati ə/d | 2205 | Cumakənd kəndi | 2205 |
| 27. | Kiçik Dəhnə kənd inzibati ə/d | 7941 | Kiçik Dəhnə kəndi | 7941 |
| 28. | Kiş kənd inzibati ə/d | 6687 | Kiş kəndi | 6687 |
| 29. | Qoxmuq kənd inzibati ə/d | 4853 | Qoxmuq kəndi | 4853 |
| 30. | Oxud kənd inzibati ə/d | 4825 | Oxud kəndi | 4825 |
| 31. | Şirinbulaq kənd inzibati ə/d | 866 | Şirinbulaq kəndi | 866 |
| 32. | Şorsu kənd inzibati ə/d | 2159 | Şorsu kəndi | 2159 |

**Mənbə:** Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi.Azərbaycan Respublikası Əhalinin Siyahıyaalınması 2009-cu il. Bakı: 9 saylı kiçik müəssisə, 2010, I hissə, s.197, 198, 199.

Növbəti inzibati-ərazi dəyişikliyi isə 2000-ci ildə edilir. 2000-ci il 5 iyul tarixindən qüvvəyə minmiş "Azərbaycan Respublikasının bəzi rayonlarının inzibati-ərazi bölgüsündə qismən dəyişikliklər edilməsi haqqında" Azərbaycan Respublikasının Qanununa əsasən rayonun ərazisində yeni inzibati-ərazi dairələri[1] təşkil edilir. Ərazi vahidlərinin bəzilərinin inzibati hüdudları olduğu kimi saxlanılaraq dairə adlandırılır. Qalanları isə yenidən təşkil edilir: Baş Kəldək kəndi Baş

[1] İnzibati-ərazi vahidləri inzibati ərazi dairəsi adlandırılır.

Küngüt kənd inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Baş Kəldək, Birinci Biləcik kəndi Aşağı Göynük kənd inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Biləcik, Bolludərə kəndi Turan qəsəbə inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Bolludərə, Çeşməli kəndi Şəki şəhər inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Çeşməli, Kiş kəndi Şəki şəhər inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Kiş, Küdürlü kəndi Daşüz kənd inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Küdürlü, Qayabaşı kəndi Turan qəsəbə inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Qayabaşı, Qudula kəndi Daşüz kənd inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Qudula, Şirinbulaq kəndi Aydınbulaq kənd inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Şirinbulaq, Şorsu kəndi Cumay kənd inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla Şorsu, İbrahimkənd kəndi Aşağı Küngüt kənd inzibati-ərazi vahidi tərkibindən ayrılaraq həmin kənd mərkəz olmaqla İbrahimkənd kənd inzibati-ərazi vahidləri yaradılır (2). Beləliklə, yeni inzibati-ərazi dəyişikliyi nəticəsində **11 yeni inzibati-ərazi vahidi** və ya inzibati-ərazi dairəsi yaradılır.

Aşağıda adlarını sadaladığımız kəndlər isə bir inzibati vahidin tərkibindən digərinə verilirlər: Baş Küngüt kənd inzibati-ərazi vahidinin Aşağı Kəldək və Oraban kəndləri Baş Kəldək, Aşağı Göynük kənd inzibati-ərazi vahidinin İkinci Biləcik və Baqqal kəndləri Biləcik, Turan qəsəbə inzibati-ərazi vahidinin Qaratorpaq kəndi Bolludərə, Şəki şəhər inzibati-ərazi vahidinin Oyrat kəndi Çeşməli, Aşağı Küngüt kənd inzibati-ərazi vahidinin Fazıl kəndi İbrahimkənd, Daşüz kənd inzibati-ərazi vahidinin Kosalı və Qızılarx kəndləri Küdürlü, Turan qəsəbə inzibati-ərazi vahidinin Sarıca kəndi Qayabaşı, Cumay kənd inzibati-ərazi vahidinin Babaratma və Qaradağlı kəndləri Qudula kənd inzibati-ərazi vahidinin tərkibinə verilir (2).

Burada yeni inzibati-ərazi vahidlərinin yaradılması səbəblərinin üzərində xüsusi dayanmaq istərdik. Rayon ərazisində apardığımız çöl tədqiqatları göstərir ki, inzibati-ərazi dəyişikliklərinə ciddi və əsaslandırılmış səbəbləri vardı ki, bunların da arasında təbii şərait və iqlim amili öndə gəlirdi. Dəyişikliklərə qədər bir-birindən məsafəcə uzaq kəndlər eyni inzibati-ərazi vahidlərinin tərkibində olduğundan kənd camaatı lazım olan hər hansı sənədi əldə etmək məqsədi ilə inzibati idarələrin yerləşdiyi mərkəzə getmək üçün əlavə gün, bəzən də bir-neçə gün itirməli olurdular. Eyni zamanda kənd sakinləri kənddəki hər hansı problemlə ərazi nümayəndələrinin, əlaqədar təşkilatların nümayəndələrinin yerində tanışlığı, araşdırması və həlli üçün həftələrlə, aylarla gözləməli olurdular.

Eyni inzibati-ərazi vahidinə daxil olan kəndlərin bəzilərini bir-birindən dağ çayları ayırdığından, yaz-payız yağışlarından sonra gələn sel sularının dağıntıları nəticəsində kəndlər arasında aylarla əlaqə itir, uzun müddət gediş-gəliş mümkün olmurdu. Sosial infrastruktur obyektləri inzibati-ərazi vahidinin mərkəzi olan yaşayış məntəqəsində yerləşdiyindən digər kəndlərlə müqayisədə daha yaxşı

inkişaf etmiş olurdu. Qalan kəndlərdə isə bunun tam əksi müşahidə edilirdi. Yeni inzibati-ərazi vahidlərinin yaradılması yuxarıda qeyd etdiyimiz bu ciddi problemlərin aradan qaldırılmasında mühüm rol oynayır. Daha yeni inzibati-ərazi vahidlərinin yaradılması ilə faktiki iki problemin çözülməsinə cəhd edilmişdir.

1. Kəndlərdə sosial infrastrukturun inkişafı, 2. Yeni iş yerlərinin açılması.

Şəki rayonunda əhalinin güzəranının yaxşılaşdırılması məqsədilə aparılan daha bir inzibati dəyişikliyin üzərində xüsusi dayanmaq istərdik. Sovet dövründə qəbul edilmiş qanuna əsasən, vaxtilə Şəki rayonunda kənddə yaşayıb kolxoz üzvü olmuş, sonradan isə şəhərdə yaşayan kəndlilər kolxozdakı torpaq payından məhrum edilmişdilər. Bu səbəbdən kolxoz, sovxozların mülkləri özəlləşdirilərkən həmin kəndlilər nəzərə alınmadılar. Buna rayonun Kiş kəndinin və Qışlaq yaşayış yerinin əhalisini misal göstərmək olar.

2000-ci ildə aparılan islahatla bu qrup əhalinin torpaq üzərində mülkiyyət hüququ özlərinə qaytarılır: Kiş kəndinin eyni adlı yeni inzibati-ərazi vahidinin tərkibinə daxil edilməsi, eyni zamanda, Şəki şəhərinin qışlaq ərazisində Çeşməli və Oyrat kəndlərinin yaradılması nəticəsində 10000 nəfərdən çox vaxtilə kolxoz üzvü olmuş sakinləri yenidən torpaq payı alırlar.

Cədvəl 6

**Şəki rayonu üzrə inzibati -ərazi dəyişiklikləri (2000-ci il)**

| | Kəndlər | Tabe oldugu inzibati-ərazi vahidləri | |
|---|---|---|---|
| | | Dəyişikliyə qədər | Dəyişiklikdən sonra |
| 1 | Baş Kəldək | Baş Küngüt | Baş Kəldək |
| 2 | I Biləcik | Aşağı Göynük | Biləcik |
| 3 | Bolludərə | Turan qəs. | Bolludərə |
| 4 | Çeşməli | Şəki şəhəri | Çeşməli |
| 5 | Kiş | Şəki şəhəri | Kiş |
| 6 | Küdürlü | Daşüz | Küdürlü |
| 7 | Qayabaşı | Turan qəs. | Qayabaşı |
| 8 | Qudulu | Daşüz | Qudulu |
| 9 | Şirinbulaq | Aydınbulaq | Şirinbulaq |
| 10 | Şorsu | Cumay | Şorsu |
| 11 | İbrahimkənd | Aşagı Küngüt | İbrahimkənd |
| 12 | Aşağı Kəldək | Baş Küngüt | Baş Kəldək |
| 13 | Oraban | Baş Küngüt | Baş Kəldək |
| 14 | II Biləcik | Aşağı Göynük | Biləcik |
| 15 | Baqqal | Aşağı Göynük | Biləcik |
| 16 | Qaratorpaq | Turan qəs. | Bolludərə |
| 17 | Oryat | Şəki şəhəri | Çeşməli |
| 18 | Fazil | Aşağı Küngüt | İbrahimkənd |
| 19 | Kosalı | Daşüz | Küdürlü |
| 20 | Qızılarx | Daşüz | Küdürlü |
| 21 | Sarıca | Turan | Qayabaşı |
| 22 | Babaratma | Cumay | Qudula |
| 23 | Qaradağlı | Cumay | Qudula |

İndi isə inzibati-ərazi dəyişikliklərinin ayrı-ayrı inzibati-ərazi vahidi və kənd yaşayış məntəqələrinin əhali sayına təsiri məsələlərinə diqqət yetirmək istərdik.

1999-2009-cu il siyahıyaalmalarının kəndlər üzrə nəticələrinin müqayisəsi maraqlı nəticələrə gəlməyə imkan verir. Şəki rayonunun ərazisində tədqiq etdiyimiz dövr ərzində aparılan inzibati-ərazi dəyişiklikləri rayonun umumilikdə sahəsinə və əhalisinin ümumi sayına təsir göstərməmişdir. Rayon əhalisinin ümumi sayında yuxarıda qeyd etdiyimiz kimi, əvvəlki illərlə müqayisədə azalma müşahidə edilsə də, ümumilikdə, artım qeydə alınmışdır. Lakin bəzi kəndlərdə, konkret olaraq, Köndələn, Abbas, Kəhrizoba, Təpəcənnət, Aşağı Şabalıd kəndlərində əhalinin sayı əvvəlki illərlə müqayisədə azalmışdır. Bəzi kəndlərdə isə artım çox cüzidir. Məsələn, 10 il ərzində Babaratma kəndində əhalinin sayı cəmi 5 nəfər, Aşağı Daşağıl və Daşbulaq kəndlərində isə 25 nəfər artmışdır. Belə demoqrafik mənzərənin yaranma səbəblərinə xüsusi diqqət çəkmək istərdik.

Demoqrafik göstəricilərə mənfi təsir göstərən səbəbləri ümumiləşdirsək iki yerə ayırmaq olar: 1. Bütün rayon əhalisi üçün aktual olan səbəblər. Məsələn, kənd yerlərində iş yerlərinin məhdudluğu, əmək haqqlarının ailələrin normal dolanışığını təmin etməyə imkan verməməsi, kəndlinin istehsal etdiyi məhsulu satmaqda çətinlik çəkməsi səbəbindən gənclərin qazanc dalınca RF, Ukrayna və Qazaxıstan kimi ölkələrə, o cümlədən Bakı şəhərinə axını və əksəriyyətinin geri dönməməsi, bu səbəbdən kəndlərdə gənc nəslin sayının sürətlə azalması nəticəsində nikahların sayının, eləcədə, dogum intensivliyinin azalması. Artıq kənd yerlərində çoxuşaqlı ailələr demək olar ki, yoxdur. Ailələrdə uşaqların sayı 2, ən yaxşı halda 3-dür.

2.Yuxarıda sadaladığımız və bütün kəndlər üçün xarakterik olan ümumi və kifayət qədər ciddi səbəblərlə yanaşı, ayrı-ayrı kəndlər üçün xarakterik olan səbəblər və onların nəticəsində baş verən daxili miqrasiyalar da həmin kəndlərin əhalisinin demoqrafik gostəricilərinə öz təsirini göstərmişdir. Bunlardan bir neçəsinin üzərində xüsusi dayanmaq istərdik: torpaqsızlıq, mərkəzdən uzaqda yerləşən, xüsusilə də dağ kəndlərində sosial infrastrukturun zəif inkişaf etməsi, mövsümi dağ çaylarının kəndlərə vurduğu dağıdıcı ziyanlar. Məsələn, Köndələn və Abbas kəndlərində əhalinin sayına təsir göstərən ən ciddi səbəb torpaqsızlıq olmuşdur. Bu kəndlərin sərhədləri birbaşa Aşağı Göynük kəndinin sərhədlərindən keçdiyindən, kənd sakinlərinin tikdikləri yeni evlər Aşağı Göynük kəndinin ərazisinə düşür və deməli, Aşağı Göynük kəndinin əhalisi bu səbəbdən təkcə təbii yox, həm də Köndələn və Abbas kəndlərinin əhalisinin miqrasiyası hesabına artır, əvəzində həmin 2 kəndin əhalisi isə azalır. Dağ kəndləri olan Kəhrizoba və Təpəcənnət sakinlərinə təbii şərait əkinçiliklə məşğul olmağa imkan vermədiyindən (Qeyd edək ki, kənd əhalisinin əsas məşğuliyyəti köçmə maldarlıq olmuşdur) son 50 il ərzində eyni ərazi vahidinə daxil olan Cəfərabad kəndində məskunlaşmışlar. Aşağı Şabalıd kəndinin demoqrafik göstəricilərinə bu kəndin Şin çayının aşağı axarında yerləşməsi və 2 dəfə güclü selə məruz qalması təsir göstərmişdir. Selin evlərini yuyub apardığı kənd sakinləri İnçə, Zunud kəndlərinə, Şəki şəhərinə köç etmək məcburiyyətində qalmışlar. Şəki rayonunun Oguz-Qəbələ sərhədində yerləşən

Aşağı Daşağıl və Qax rayonu ilə sərhədində yerləşən Daşbulaq kəndlərinin əhalisinin sayının azalmasına həmin kəndlərin inzibati-ərazi vahidi mərkəzindən, eləcə də rayon mərkəzindən uzaqda yerləşməsi, sosial infrastrukturun zəif inkişaf etməsi, xüsusilə yol problemi təsir göstərmişdir. 2000-2004-cü illərdə həmin kəndlərin yollarının abadlaşdırılması və istehsal sahələrinin (camışçılıq təsərrüfatı) yaradılması nəticəsində əhalinin güzəranı qismən yaxşılaşdırılmışdı ki, bu da öz növbəsində, demoqrafik göstəricilərin artmasına səbəb olmuşdur.

Beləliklə, tədqiq etdiyimiz dövr ərzində Şəki rayonunun sərhədləri daxilində 2 inzibati-ərazi dəyişikliyi aparılmışdır. Zəif inkişaf etmiş yaşayış məntəqələrinin inkişafı məqsədilə aparılmış bu dəyişikliklər əhalinin demoqrafik inkişafına öz müsbət təsirini göstərmişdir.

**ƏDƏBİYYAT**


1. Ərazi quruluşu və inzibati-ərazi bölgüsü haqqında Azərbaycan Respublikasının Qanunu. Maddə 5. Azərbaycan Respublikasının ərazi quruluşunun və inzibati-ərazi bölgüsünün əsasları. H.Əliyev. Bakı şəhəri, 13 iyun 2000-ci il ./http://www.taxes.gov.az /modul.php?name=qanun&news=886
2. Azərbaycan Respublikasının bəzi rayonlarının inzibati-ərazi bölgüsündə qismən dəyişikliklər edilməsi haqqında Qanun. Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyev**.** Bakı şəhəri, 5 oktyabr 1999-cu il. / http://e-qanun.az /files / framework / data/ 3/f_3052.htm; 5 iyul 2000-ci il http://e-qanun.az/?internal=view&docid=649&doctype=0
3. Azərbaycan Respublikası Əhalinin Siyahıyaalınması 1999-cu il. Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. I hissə. Bakı: Səda, 2000, 566 s.
4. Azərbaycan Respublikası Əhalinin Siyahıyaalınması 2009-cu il, Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. I hissə. Bakı: 9 saylı kiçik müəssisə, 2010, 630 s.


## АДМИНИСТРАТИВНО-ТЕРРИТОРИАЛЬНОЕ ДЕЛЕНИЕ ШЕКИНСКОГО РАЙОНА В 1991-2009 гг. И ВНЕСЕННЫЕ В НЕГО ИЗМЕНЕНИЯ


**А.А.МАМЕДОВА, У.М.ПАШАЕВА**


**РЕЗЮМЕ**


Статья посвящена административно-территориальному делению Шекинского района, играющего важную роль в политической, экономической и социальной жизни Азербайджанской Республики. На основе материалов переписей прослеживаются изменения, произошедшие в административно-территориальном устройстве и в численности населения района. В ходе исследования были получены результаты, позволяющие выявить темпы развития района и причины, повлиявшие на рост населения в указанный период.



**Ключевые слова:** Шеки, Шекинский район, Азербайджанская Республика

## ADMINISTRATIVE-TERRITORIAL DIVISION OF SHEKI REGION IN 1991-2009 AND CHANGES MADE TO IT

**A.A.MAMMADOVA, U.M.PASHAYEVA**

**SUMMARY**

The article is devoted to the administrative-territorial division of Sheki region, which plays an important role in political, economic and social life of the Azerbaijan Republic. On the basis of census materials were traced changes in the administrative-territorial system and population of the region. The obtained results allow revealing the pace of development of the region and the reasons that influenced the growth of the population during this period.

**Key words:** Sheki, Sheki region, the Republic of Azerbaijan